**Kitabın Orjinal adı:**

Niçin Namaz?

**Müəllif:**

Vehbi Karakaş

**Anadolu türkcəsindən Azərbaycan dilinə tərcümə edən:**

Nurlan Məmmədzadə

**Kitabın Azərbaycan nəşrinin adı:**

Kimə Təşəkkür Etməli?

**Bakı-2017; İpəkyolu Nəşriyyatı;**
**İSBN: 978-9952-8221-1-3**

Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin 29 mart DK-239/M nömrəli razılıq məktubu ilə nəşr edilmişdir.




İPƏKYOLU NƏŞRİYYATI

Bakı Şəhəri Səbail Rayonu
Cəfərov Qardaşları, 16.
Tel: (+994 12) 492 14 38
Mobil: (+994 51) 412 22 82
Web sayt: www.ipekyolunesriyyati.az
Elektron poçt: ipekyoluneshriyyati@gmail.com

# ÖN SÖZ

## SƏCDƏ ET, YAXINLAŞ!

Bizi yaradan və saysız-hesabsız nemətləri ilə təchiz edən Rəbbimiz Qurani-Kərimdə buyurur: **"...Biz ona (insana) şah damarından da yaxınıq!".** (Qaf, 16) Hər halımızı görən, bizi eşidən, hətta söyləmədiyimiz halda qəlbimizdən keçirdiklərimizi belə duyaraq cavab verən Rəbbimiz bizim də Ona yaxın olmağımızı istəyir. Bəşər övladını peyğəmbərlər və ilahi kitablarla şərəfləndirməsinin başlıca səbəbi də məhz budur. İnsanın Allaha yaxınlığını artıran ibadətlərin başında heç şübhəsiz ki, namaz ibadəti gəlir. Hz. Peyğəmbər namaz üçün "gözümün nuru" ifadəsini işlətmiş və son nəfəsini verərkən də səhabələrin timsalında biz ümmətinə namaza həssas yanaşmağı tövsiyə etmişdir. Namazın ən şirin anı isə bəndənin bütün səmimiyyəti ilə heçliyini ortaya qoyduğu səcdə anıdır.

Namaz və səcdə insanın Rəbbini tanıdığının əməli isbatıdır. Ona boyun əyib əmrlərinə itaətin bir təzahürüdür. Allah-Təala iman gətirənlərdən hər gün beş dəfə namaz qılmağı tələb edir. Nə üçün namaz? Çünki qulluq şüuru ilə qıldığımız namaz bizi nəfs boyunduruğundan xilas edərək ilahi təzimlə hürriyyətə qovuşdurur.

Hz. Peyğəmbər (s.ə.s) insanın Allaha ən yaxın anının səcdə olduğunu belə xəbər verir: "*Qulun Rəbbinə ən yaxın olduğu an səcdədir. Elə isə səcdədə duanı artırın*". Bu hədisi-şərif eyni zamanda Allahdan uzaq qalan insanlara Ona yaxınlaşma yolunu göstərir. Çünki insanın həqiqi şərəfi Rəbbinə yaxınlığı nisbətindədir. Əshabi-kiramdan Rəbia ibn Kəb əl-Əsləmi belə rəvayət edir:

*"Bir gecə Rəsulullah (s.ə.s) ilə birlikdə idik. Ona dəstəmaz alacağı suyu və ehtiyacı olan digər əşyaları gətirdim. Mənə belə buyurdu:*

*- Ürəyindən nə keçirsə, mənə söylə! Mən:*

*- Ey Allahın Rəsulu, izn ver, bir az fikirləşim, sonra deyim,- söyləyərək möhlət istədim. Öz-özümə fikirləşdim və dünya həyatının keçici olduğu, bu dünyada Rəbbimin ruzimi verəcəyi qənaətinə gələrək Hz. Peyğəmbərdən axirətlə bağlı bir şey istəməyə qərar verdim. Sonra Rəsulullahın hüzu-*

*runa çıxdım, məndən nə qərara gəldiyimi soruşduqda belə dedim:*

*- Ey Allahın Rəsulu, cəhənnəmdən xilas olmam üçün mənə şəfaət etməni istəyirəm. Rəsulullah (s.ə.s):*

*- Ey Rəbia, bunu sənə kim öyrətdi,- deyə soruşdu. Belə cavab verdim:*

*- Səni Haqq ilə göndərən Allaha and olsun ki, heç kim öyrətmədi. Sən "ürəyindən keçəni istə" dediyin zaman Allahın Peyğəmbəri olduğunu, Onun qatındakı dərəcəni düşünərək "dünya həyatı fanidir, yaradan özü bu dünyadakı ruzimi verər, yaxşısı budur ki, mən Rəsulullahdan axirətimi istəyim",- deyə bu qərara gəldim. Rəsulullah (s.ə.s) bir az sükut etdikdən sonra belə buyurdu:*

*- Bu dediyini qəbul edirəm, ancaq sən də çox səcdə edərək mənə kömək etməlisən!"* (Əhməd b. Hənbəl, Təbərani)

Əbədi axirət yurdunda səadətə qovuşmağı arzulayrıqsa, günahkarların sığınacaq axtardığı bir anda Allah Rəsulunun himayəsində olmaq istəyiriksə, haydı, namaza!...

***Nurlan Məmmədzadə***

## KİMƏ TƏŞƏKKÜR ETMƏLİ?

İnsan varlı da ola bilər, sənətkar da. On barmağının hərəsində ayrı bir məharət də olsa, əgər niyə var olduğunu düşünməz, həyatın qayəsini axtararaq həqiqi yaradılış sirrlərini araşdırmaz və mükəmməl şəkildə yaradılmış bu dünyaya ibrət nəzəri ilə baxmazsa, var-dövləti, qabiliyyət və istedadı ona heç bir dəyər qazandırmayacaqdır.

Allahın yaratdığı ağıldan məhrum o qədər canlı var ki, insan oğlundan daha sənətkar, daha hünərlidir. Arı, ipəkqurdu, inək, qoyun, keçi… Hər biri zəmanəmizin inkişaf etmiş fənninə, sənətinə və texnikasına meydan oxuyur. Onlardan əldə etdiyimiz balı, ipəyi, əti, südü küm istehsal edə bilər? XX əsrin nə fənni, nə də inkişaf edən texnikası hələ də dizelsiz və benzinsiz uçan təyyarə istehsal edə bilməyib. Amma arı, kəpənək, quş və bu kimi varlıqlar dünya yaranandan bəri heç bir yanacaq sərf etmədən uça bilirlər. Biz də qazma işi görürük, ağcaqanad da. Amma çox vaxt biz qazma qurğularımızla susuz və neftsiz əraziləri qazıb əliboş qa-

yıtdığımız halda ağcaqanadlar kiçicik xortumlarını qan çıxmayacaq yerlərə batırmırlar.

XX əsrdə yaşayan insan Edissona minnət borcu hiss edərək onu ehtiramla yad edir. Bəlkə də bu gün yaşasaydı, elektiriki kəşf edərək dünyanı aydınlatdığı üçün bütün universitetlər ona fəxri akademik adı verərdi.

Yoxsa inək, arı, keçi və digər heyvanların xidməti Edisonun etdiklərindən geri qalır? Elə isə dünyanın qabaqcıl universitetləri nə üçün inəklərə, arılara, keçi və digər heyvanlara fəxri akademik adı vermir? Nə üçün onlara təşəkkür etmir? Edisonun cənnətə girməsi üçün dəridən-qabıqdan çıxanlar nə üçün inəyin cənnətə girməsini müdafiə etmirlər.

- Axı o inəkdir. Heyvandır. Heyvana təşəkkür etməzlər, onlar cənnətə də girməzlər. Heyvanlara ehtiram harda görülüb?

Eləmi? Deməli, hünərləri onları qurtara bilmədi. Bəs bizim insanlığımıza nə deyək? Meydanda inkarı qeyri-mümkün olan bir yaxşılıq var. Mərifətimizin tələbi olaraq yaxşılıq edənə təşəkkür etməməliyikmi? Narı budaqları ilə bizə uzadan ağaca təşəkkür etmirik ki, ağacdır. İnəyə də hey-

van olduğu üçün təşəkkür etmirik. Bəs biz kimə təşəkkür etməliyik?

Özünü intelligent sayanlardan soruşuram: Bizə heyvanların və ağacların əli ilə gələn bu yaxşılıqların əvəzini necə və nə ilə ödəyəcəyik. Onları kəsib ətini yeməklə, yoxsa yandırıb isinməklə? Budurmu sizin insanlığınız, mədəniyyət və ittelligentiniz?

Ya gülünc də olsa inəyin, ağacın qarşısında dayanıb təşəkkür edəcəksiniz, yaxud da ağlınızı başınıza yığıb materialist fəlsəfənin heç nəyə yaramadığını dərk edərək nemətlərin əsl sahibini tanıyaraq "Allah" demək məcburiyyətində qalacaqsınız. Heyvanları canlı fabrik kimi yaradan, otu ətə, südə, gübrəni gülə, çiçəyi bala, balı və digər qidaları spermaya, onu da insana çevirən insandan da təşəkkür və ibadət meyvəsi istəyən Rəbbimizə, Allaha dönəcəksiniz. Əks təqdirdə nə sənətiniz, nə fənniniz, nə də sahib olduğunuz texnika sizi qurtaran deyil.

## İnsanı insan edən ibadətdir

"Bülbül nə qədər gözəl oxusa yenə də quşdur" – deyiblər. Bülbül olmaq, bal və süd vermək heyvanı heyvanlıqdan qurtarmadığı kimi zəngin,

hünərli və sənətkar olmaq, ali məktəb bitirmək, gözəl üzə, gözəl gözə və səsə sahib olmaq da insanı insan etməyə kifayət deyil. İnsanı insan edən, hətta sultan edən imandır. Yəni Allahı tanımaq, sevgi və həyəcanla Ona ibadət etməkdir.

İmanlı bir adamın universitet oxuması, sənətkar olması pisdirmi? Xeyr, əsla. Həzrət Peyğəmbər (s.ə.s) tənbəllikdən Allaha sığınmışdır.[1] Dinimiz bəşəriyyətə imanla elmi birlikdə bəxş etmişdir. Onları bir-birindən ayıranlar utansın.

"Elmsiz din kor, dinsiz elm topaldır" sözü nə qədər yerində söylənmişdir.

Dinsiz və elmsiz heç nəyə nail ola bilmərik. Nə kor, nə də topal olmağa razıyıq. Əgər imanla elmi barışdırsaq, ətrafımızı Quranın sönməz nuru ilə işıqlandırmağı bacarsaq, dünyadakı bütün xalqlar ardımızca gələcək.

Allah-Təala gücümüz çatmayan heç nəyi bizə yükləməmişdir. Nə ali məktəbdən məzun olmaq, nə zəngin olmaq, nə sənətkar olmaq, nə də elektriki kəşf etmək cənnətə girmək üçün şərt deyil. Əgər cənnətə girmək üçün bunlar şərt qoşulsaydı, yalnız universitet məzunları, sənətkarlar və ya

---

1. Buxari, Cihad 25

Edisson girərdi. Halbuki cənnətə girməyin şərti iman, elm və ibadətdir.

Yəni hər bir insanın öhdəsindən gələ biləcəyi hədsiz dərəcədə asan şeylərdir. Hər insan zəngin, sənətkar, ola bilməz, elektriki kəşf edə bilməz. Amma qadın və ya kişi olmasından, gənc və ya yaşlı, sağlam və ya xəstə olmasından asılı olmayaraq hər kəs imanlı ola və namaz qıla bilər. Rəbbimizin insandan gücü çatan şeyləri istəməsi Onun böyük lütfünün və geniş mərhəmətinin təzahürüdür. Bu da öz növbəsində şükür etməyi zəruri qılır. Ona nemətlərinin sayı qədər şükürlər olsun...

***Bir sual:***

Ağacların meyvəsi bəllidir. İnək, qoyun və keçinin meyvəsi süd, arının meyvəsi bal, günəşin meyvəsi istilik və işıq, balığın meyvəsi balıq, toyuğun meyvəsi yumurtadır... Sadaladığımız bütün varlıqlar meyvələrini özləri yemədən insana verir. Bəs insanın meyvəsi nədir və o meyvəni kimə təqdim etməlidir?

***Cavab:***

Bütün varlıqlar verilən vəzifələri layiqincə yerinə yetirdiyi halda insan başıboş qala bilməz.[2] Ondan da bir meyvə gözləyən var. O meyvənin adı ibadət və namazdır. Təqdim olunacaq varlıqsa Allahdır.

O meyvəni yalnız Allah ala bilər. Onun qiymətini yalnız Allah verə bilər. Çünki həmin meyvənin qiyməti cənnətdir. Uca Allah belə byurur:

“Allah möminlərin mallarını və canlarını onlara (veriləcək) cənnət müqabilində satın almışdır...”[3]

Can sərmayənizi məscid bazarında və axirətin sandığı olan namaz səccadəsində Allaha satsanız, inşallah, əvəzində cənnəti alarsınız.

Əsl həqiqətin nə olduğu anlaşılsın deyə bir misal vermək istəyirəm:

Əgər insanın əsl vəzifəsi namaz olmasaydı, nə olardı görəsən, bunu düşündünüzmü? Bir-birindən gözəl və tərtəmiz meyvələrdən yeyib nəcis istehsal edən, sonra da onu ayaqyoluna boşaldan maşından heç bir fərqi qalmazdı. Mətbəxlə ayaqyolu arasında işləyən bir maşın.

---

2. əl-Muminun, 115
3. ət-Tövbə, 111

Bağçamızdakı ağaclar gübrə ilə qidalanaraq vitaminli və nəfis meyvələrini bizə versin, biz də həmin meyvələrdən yeyib gübrə istehsal edək. Bu nə qədər doğrudur? İbadətsiz, imansız, İslamsız, namazsız keçən həyatın nəticəsi məhz budur. Sadəcə meyvələri deyil, bütün kainatı yeyib kanalizasiyaya ixrac etmək... Bundan böyük cinayət olmaz və təbii ki, bu cinayət cəzasız qalmaz. Ona görə də Allah-Təala insanlığın və İslamın dəyərini verə bilməyənlərə, bunun gərəyini yerinə yetirməyənlərə belə xəbərdarlıq edir: "O gün mütləq surətdə bütün nemətlərdən hesaba çəkiləcəksiniz".[4] Qiyamət günündən, böyük məhkəmədən və cəhənnəmdən xəbər verir.

Gənc dost! Sən sürətlə axirətə tərəf irəliləyirsən. Cənnət üçün yaradıldığını unutma. Allah səni şərəfli yaradıb, ən ali vəzifəni də sənə verib. Özünü hədər etmə. İbadətsiz həyata əlvida de. Namaza başla. Sənə bu gerçəyi xatırladanlarla əlaqəni gücləndir. Bu istiqamətə yönəlməyin səni pis yoldaşlardan və mühitdən qurtaracaq. Namaza başladığını görüb çox sevinəcəyik. Haydı, qardaşım, haydı, can dostum!

---

4. ət-Təkəsur, 8

## İLAHİ ÇAĞIRIŞ

Sıravi kimə deyilir? Əsgərlik xidmətini yerinə yetirənlər bunu yaxşı bilirlər, amma yenə də xatırladaq:

Sıravi hər bir ehtiyacı dövlət tərəfindən təmin olunan rütbəsiz əsgərdir. Sıravi əsgər verilən hər bir vəzifəni mükəmməl və zamanında yerinə yetirmək məcburiyyətindədir. Əsgər vəzifəsini yerinə yetirməmək üçün heç bir bəhanə gətirə bilməz. Havanın isti-soyuqluğunu bəhanə gətirib tapşırıqdan boyun qaçıra bilməz. “Növbədəsən” təlimatı qarşısında “yuxum gəlir”, “yorğunam” deyə bilməz. Qeyd-şərtsiz itaət xaricində heç nə edə bilməz.

Qul kimdir? Gözlə görünən-görünməyən, qulaqla eşidilən-eşidilməyən, əl ilə tutulan və ya tutulmayan hər bir ehtiyacı Allah tərəfindən təmin olunan rütbəli-rütbəsiz, zəngin-yoxsul, mömin-kafir hər insana qul deyilir.

Dövlət əsgərinə ayaqqabı verir, amma ayaq vermir. Gözlük verir, amma göz vermir. Qulaqlıq verir, amma qulaq vermir. Paltar verir, amma bədən vermir. Sadəcə müəyyən şeyləri verə bilir. Bunun müqabilində qeyd-şərtsiz təslimiyyət, itaət və bir çox fədakarlıqlar istəyir. İnsan da bütün bunlara boyun əyir.

Allah-Təala həm can verib, həm də cəsəd. Həm ruh verib, həm də ona bədən libası biçib. Həm ağciyər verib, həm də tənəffüs ediləcək hava. Həm göz verib, həm də görmək qabiliyyəti. Həm qulaq verib, həm də eşitmək bəxş edib. Həm burun verib, həm də qoxulamaq verib. Həm iştahlı bir mədə verib, həm də önümüzə kainat süfrəsi açıb. Bir sözlə, həm bizə lazım olan əza və orqanlar bəxş edib, həm də həmin orqanlara lazım olacaqları yaradıb.

Dövlət tərəfindən bəzi ehtiyacları təmin olunan əsgər komandirinə qeyd-şərtsiz tabe olduğu halda bütün ehtiyacları Allah tərəfindən qarşılanan bəndə nə üçün Allaha itaət etməsin, nə üçün Onun verdiyi vəzifələri yerinə yetirməsin?

Komandir əsgəri çağırdığı zaman "bir dəqiqə, ayaqqabımı boyadıram", yaxud "işim var, qurtarsın gəlirəm", deyə bilərmi? Əlbəttə ki, yox. Al-

lah-Təala hər gün bəndəsini beş dəfə çağırır. Elə isə insanın "bir dəqiqə, evimi təmir edirəm, villa tikirəm, bu işlər qurtarsın, 40-50 yaşımda gələrəm" – deməsi tərbiyəsizlik sayılmazmı? Yaxud da Allaha inanmasa, azana düşmən kəsilsə, zindana, əzaba, cəhənnəmə layiq olmazmı? Allahın mülkündə gəzib, Onun verdikləri ilə bəsləndiyi halda üsyan edənlər cəhənnəmə layiq deyillərmi?

## Cəbhədə namaz

O gün bir nəfər belə bir sual verdi:

- Müəllim, bütün günü işdə oluram. Qılmadığım namazların hamısını axşam evdə qəza etsəm olmazmı?

Suala sualla cavab verdim:

- Elə fərz et ki, əsgərlikdəsən. Gün ərzində komandir sənə beş dəfə xəbər göndərsə və sən heç birində yanına getməyib, axşam hüzuruna çıxsan, sonra da ard-arda beş dəfə salam verib əmrinə müntəzir olduğunu desən olarmı?

Həmin adam bu cavab qarşısında nə qədər yanlış düşündüyünü qəbul edərək üzr istədi və təşəkkür edərək yanımdan ayrıldı.

Müharibə zamanında belə namazın sonraya buraxılmasına icazə verilməyərək, cəbhədə, düşmən təhlükəsi hiss edildikdə, sel və yanğın qorxusunun[5] olduğu bölgələrdə nə cür namaz qılınacağının tərifi verilmişdir[6].

Bizi Allah çağırır bəylər, Allah. Padişah sizə dəvətnamə göndərdiyi zaman "gözlə işlərimi bitirib gələrəm" deyə bilərsinizmi? Yoxsa hər işinizi bir kənara qoyar, Padişahın dəvətinəmi gedərsiniz? Ağıllı olan kəs, padişahın dəvətinə gedər. Məhz bu səbəblədir ki, ağıllı olanlar namaza tərəf tələsməkdədirlər. Çünki dəvət Allahdan gəlmişdir.

---

5. Şurunbilali, Məraqil-Fəlah, (Tahtavi haşiyəsi) s.363.

6. Bu namaz fiqh kitablarında "Salatul-Xavf-Qorxu Namazı" olaraq qeyd edilməkdədir. Sərhəd xəttində olan bütün əsgərlər eyni imamın arxasında namaz qılmaq istəyirlərsə imam, cəbhəni boş buraxmamaq üçün əsgərləri iki qrupa ayıracaq. Bir qrup sərhəddə keşik çəkəcək, qalan qrupla iki rükətli namazların bir rükətini, üç və ya dörd rükətli namazların iki rükətini qıldıqdan sonra, imamın arxasındakılar gedəcək, cəbhədəkilər gələcək, imam qalan bir və ya iki rükəti onlarla qıldıqdan sonra bir tək özü salam verəcək, camaar salam vermədən yenidən sərhədə gedəcək, cəbhədəkilər gələrək yarım qalan namazlarını heç bir şey oxumadan tamamlayaraq salam verəcəklər. Sərhəddəkilər də istər olduqları yerdə, istəyərlərsə əvvəlki namaz qıldıqları yerdə surələr oxuyaraq namazlarını tamamlayarlar. Belə olduğu təqdirdə həm Allahım əmri olan namazı qılacaqlar, həm də cəbhə boş buraxılmayacaq. (Daha ətraflı məlumat üçün bax: Şurunbilali, e.ə, s.363-365; İbni Abidin, c.1, s.72-75; İxtiyar, c.1, s.88-90).

Çünki mülk Onun, yer Onun, göy Onun, hər şey Onundur, O hər şeyə gücü çatan mütləq qüdrət sahibidir[7]. Sən acizsən, fəqirsən. O isə tərifə layiq bir Ğaniyy, bir zəngin. Elə bir zəngindir ki, hər şey Ona möhtac və O heç bir şeyə möhtac deyildir[8]. Qulların fərmanı Onun əlində. Dərdlilərin dərmanı Onun qatında. Öldürən O, dirildən O.

7. Ali-İmran, 189.
8. Fatir, 15.

## QILDIĞIMIZ HƏR NAMAZA GÖRƏ BİZƏ QIZIL VERSƏYDİLƏR

Uca Allah bizdən nə istəyir?  Ruzimi, namazmı? Onun uca əmrinə qulaq asaq:

“Ailənə namaz qılmağı əmr et, özün də ona (namaza) səbrlə davam et. Biz səndən ruzi istəmirik,  (əksinə) sənə ruzi verən Bizik. Gözəl aqibət təqava sahiblərinindir[9].”

Biz insanlar Allahın qullarıyıq. Allahdan başqalarına qul olmaq zillət və səfalət olduğu halda, Allaha qul olmaq şərəf və səadətdir. Çünki allahdan başqa hər şey, varlı olsun, kasıb olsun bir məxluqdur (yaradılmışdır).

Səni əmri altında işlədənlər də sənin kimi yaradılmış bir məxluq olduqları üçün, sənin möhtac olduğun şeyə onlar da möhtacdır.

Amma allah elə deyil. Allah, məxluq olmadığı üçün məxluqun möhtac olduğu şeylərə də möhtac

9. Taha, 132.

deyil. Yeməyə, içməyə, yatmağa, doğmağa, doğulmağa, zamana, məkana, heç bir şeyə möhtac deyil[10].

Ona görə də Allah bizdən ruzi istəmədiyi kimi dolanışıq dərdiylə ölməyimizi də istəmir, yaratdığı bütün canlıların ruzisinin Ona iad olduğunu bu şəkildə bəyan etmişdir: "Ye üzündə yaşayan hər canlının ruzisi, yalnız Allaha aiddir. Allah onların (ata belindəki, ana bətnindəki və ya dünyadakı) sığınacaqlarını da, əmanət qoyulacaq (ölüb dəfn ediləcək) yerlərini də bilir"[11]. Və Kainatı bir ruzi deposu halına çevirmişdir.

Gəldiyimiz bu dünyada bizə lazım olan hər şeyi hazır tapdıq. Duzumuz, yağımız, pendirimiz, ətimiz, südümüz, hər şeyimiz hazırdır. Sobamız, havamız, suyumuz, dənizimiz, bağ-bağçamız, ovalıq və düzənlərimiz, hamısı bizim üçün hazırlandı. Neft, qaz, odun, kömür, bəli, hər şey yerli-yerində.

Kainata baxanda aydın görürük ki, vəzifəmiz ruzi vermək deyil, verilən ruzidən istifadə edərək Rəzzaqa şükür etməkdir. Dolanışıq üçün bütün çırpınışlarımız var olan neməti ağzımıza aparmaqdan ibarətdir.

---

10. İxlas, 2-4; Bəqərə, 255.
11. Hud, 6.

Kainatı ruzilərlə zəngin qılan, bizi nemətlərlə təchiz edən Rəbbimiz bunun əvəzində bizdən sadəcə sevgi və təzim istəyir. Sevgi və təzimin ifadəsi olan beş vaxt namaz istəyir. Yəni ibadət istəyir. Belə buyurur:

**“Mən onlardan ruzi istəmirəm. Mən onlardan Məni (ehtiyacı olan bəndələrimi) yedirtmələrini də istəmirəm! Şübhəsiz ki, ruzi verən də, qüvvət sahibi də, yenilməz olan da Allahdır!”.**[12]

***Sual:***

Bu izahlardan insanın əsl işinin namaz olduğunu dərk edirik. Madam ki, işimiz namazdır, işçinin əmək haqqı nağd verilməli deyilmi? Məsələn, hər namaza görə filan qədər qızıl vəd edilsəydi və səccadəmizin üstünə qoyulsaydı, biz də heç bir namazımızı qaçırmazdıq. Belə olsa daha yaxşı olmazdımı?

***Cavab:***

Ey bu sualı verən dostum, səhv fikirləşirsən. Çünki biz əmək haqqımızı əvvəlcədən almışıq. Artığını istəmək haqqımız yoxdur.

---

12. əz-Zariyat, 58-57.

Hər gün cibinizə yüz qızıl qoyanı sevərsiniz, yoxsa günəşi çıraq və soba edib sarayınızın tavanından asanı?

Əlbəttə ki, günəşi çıraq edib səmanızı bəzəyəni sevərsiniz. Çünki günəş olmasa nə qızıl olar, nə də onu cibinizə qoyan. Nə siz olarsınız, nə də dünyanız. Görəsən, bizim qıldığımız beş vaxt namaz bu nemətin əvəzində təşəkkür yerinə keçməyə kifayət edirmi? Hələ biz səccadənin üzərində qızıl gözləyirik. Dünyamız başdan-ayağa qızıl olsa, günəş olmadıqdan sonra nə dəyəri var? Su olmasa, hava olmasa nə qiyməti var?

O bizi ən mükəmməl şəkildə yaradıb. İstəsəydi daş da edə bilərdi, amma canlı varlıq olaraq yaradıb. Heyvan da canlıdır, amma insan kimi yaradıb. İnsan kimi yaradıb, amma dəli də insandır, bizi ağıl sahibi olaraq yaradıb. Ağıl neməti verib, amma başıboş buraxmayıb, ən böyük insanlıq sayılan İslamiyyəti sənə lütf edib və səni əbədi səadətə, əbədi cənnətə namizəd qılıb.

## Sən mənim qəlbimə bax

Mehmed Kırkıncı hocanın "Hikmət Pınarları" kitabında belə bir misal yer alır. Oxumadan həkim olmaq istəyən bir orta məktəb məzununa:

- Tibb fakültəsinə müraciət edib elm təhsil et, - dedikdə:

- Sən mənim qəlbimə bax. Tibb fakültəsinə imanım, həkimliyə qarşı o qədər sevgim var ki, sözlə ifadə edə bilmirəm. Siz oxumağa davam edin, amma mən hamınızdan əvvəl həkim olacağam.

İslamın şərtlərini yerinə yetirməyən bəzi insanlar da belə demirlərmi?

“Siz namaz qılmağa davam edin. Mən qılmıram, amma (daha doğrusu Allahın əmrlərinə məhəl qoymuram) elə bir imanım var ki, Allaha sevgim o qədər böyükdür ki, cənnətə sizdən əvvəl girəcəyəm”.

Yəqin ki, tibb fakültəsinə getməyən, müəllimlərə qulaq asmayan tələbələr həkimlik peşəsinə yiyələnə bilmədikləri kimi kəlmeyi-şəhadətlə İslam məktəbinə daxil olmayan və bu məktəbin şərtlərinə riayət etməyənlərə də cənnətə giriş qəbzi verilməyəcəyini siz də qəbul edərsiniz.

Qəlbi təmiz olanlar və Allaha inandığını dilə gətirənlər bilirsinizmi nə ediblər? Beş vaxt namazı qılmaqla kifayətlənməmiş, hətta gecənin yarısı yuxudan durub namaz qılıblar. Ramazan orucu ilə

kifayətlənməyib hər ayın bir neçə günün oruclu keçiriblər. Mallarının zəkatını verməklə kifayətlənməyib əlavə sədəqə və yardımları ilə zəiflərin, möhtacların imdadına çatıblar. Minikləri olmadığı halda uzun səhra yollarından keçərək Kəbeyi-Müəzzəməyə gediblər. Mallarını və canlarını fəda edərək İslamı bütün dünyaya yayıblar. Budur qəlbi təmiz müsəlmanlar.

İbadətsiz və əziyyətsiz cənnəti qazanmaq mümkün olsaydı, onlar da "nəyimə lazımdır" – deməzdilərmi? Yaxud da "mənim qəlbim təmizdir" – deyib imanı və İslamı qəlbə və vicdana həvalə etməzdilərmi?

"Mənim qəlbim təmizdir" deyən binamazlar unutmasınlar ki, "cənnət ucuz deyil, cəhənnəm də lüzumsuz".

## İNSANIN OLDUĞU YERDƏ KAİNAT DA VAR

Mömin Allaha olan imanı və etdiyi ibadətlərlə hər şeyi Allaha qulluğa sövq etdiyi halda, kafir də inkar və üsyanları ilə hər şeyi Allaha üsyana vadar etdirir. Çünki kainat insana bağlıdır. İnsan hansı istiqamətə çevrilərsə, kainat da o istiqamətə çevrilər. İnsan namaz qılarsa kainatı namaza səfərbər etmiş olar. Zina edərsə kainatı da o mundar işlə məşğul etmiş olar.

Bir misal verək: hər hansı bir ölkənin ordu generalı dövlət başçısına itaət edərsə, bütün ordu da itaət edər. Üsyan edərsə, bütün ordu da üsyana qalxar. Elə isə onun itaəti bütün ordunun itaəti sayılar, mükafatı da bir o qədər böyük olar. Üsyan edərsə də bütün ordunun üsyanı sayıldığı üçün cəzası da həmin nisbətdə ağır olar. Çünki o sıravi əsgər deyil, bütün ordular ona tabedir.

İnsanın da kainatdakı yeri budur. O, bir quldur, amma bütün qulların, yəni bütün məxluqatın

tabe olduğu ən yüksək rütbəli quldur. Kainat adlanan ucsuz-bucaqsız məmləkətin sahibi olan Allah yaratdığı bütün varlıqları onun əmrinə verərək "qulluq içində sultan" etmişdir. Onu canlı-cansız bütün varlıqlardan ibarət ordunun başına təyin etmişdir. Hər şeyi ona boyun əydirmiş, onun da yalnız özünə boyun əyməsini, itaət və ibadət etməsini istəmişdir.

Bu qədər ali rütbəyə layiq görülən insan Allahı tanımaz və Ona üsyan edərsə, özünə bağlı olan bütün varlıqları, mikroblardan qalaktikalara qədər bütün orduları üsyana cəlb etmiş olar. Yəni bütün varlıqları üsyana səfərbər etmiş sayılar.

Artıq həmin insanın günahı bir deyil, milyon deyil, bütün varlıqların sayı qədərdir. Belə bir adamı da yəqin ki, cəhənnəmdən başqa heç nə təmizləyə bilməz.

İndi isə bunun əksini fikirləşək. İnsan sahib olduğu məqamın qiymətini dərk etsə, onu həmin mövqeyə layiq görənin və insanlıq kimi ən böyük rütbə ilə təltif edənin Allah olduğunu bilsə, Ona iman və itaət etsə, bunun da savabı bir deyil, milyon deyil, məxluqatın sayı qədər olar. Məhz bunun da mükafatı əbədi cənnət olacaq.

Bir sözlə, insan sonsuz xeyrə qabiliyyətli olduğu kimi hüdudsuz şərə də qabil fitrətdə yaradılmışdır.

Xülasə, kainat və ondakı bütün varlıqlar sənin həyatını davam etdirmək üçün əl-ələ, çiyin-çiyinə səfərbər olmuşdur. Ya onların önünə keçib birlikdə Haqqın hüzurunda səcdəyə qapanacaqsınız, yaxud da bu qədər nəhəng kainatı və içindəkiləri ardına salıb günah bataqlığına sürüklənəcəksən. Kainatı qarnının və şəhvətinin əmrinə verib cəhənnəmin dibinə yuvarlanacaqsan. İradə bizim əlimizdədir, istədiyimiz yolu seçməkdə sərbəstik.

## NAMAZ DƏRDİMİN DƏRMANIDIR

Bəzən tənbəllik ucbatından namazı tərk edənlərin belə dediyini eşidirik: “Allahın bizim ibadətimizə nə ehtiyacı var ki, Quranda israrla ibadət etməmizi istəyir”.

Əlbəttə ki, Allah-Təala heç nəyə möhtac olmadığı kimi bizim ibadətimizə də möhtac deyil. İbadətə möhtac olan bizik. Çünki hər birimiz mənən xəstəyik. İbadətsə mənəvi yaralarımıza məlhəm, dərdimizə əlacdır.

Hər hansı bir həkim xəstəsinə olan mərhəməti səbəbi ilə faydalı dərmanları içməsində israr etsə, xəstə deyə bilərmi ki, “sənin ehtiyacın olduğu üçün bunları mənə içirməkdə israr edirsən”. Çox mənasız oldu, elə deyilmi?

“Allahın mənim namazıma nə ehtiyacı var ki, ibadət etməyimi istəyir?” – demək də bunun kimi tamamən məntiqə ziddir.

Çünki dərman içmək həkimin deyil, xəstənin xeyrinədir. Namaz qılmaq da elədir. Allahın deyil, bəndənin xeyrinədir. Çünki xəstə olan insandır. Hər cür pislikdən qorunmaq ethiyacı hiss edən odur. Dərman insanı maddi xəstəliklərdən qoruduğu kimi namaz da maddi xəstəliklərin ocağı olan günahlardan və pisliklərdən qoruyur.

Günahlar maddi xəstəlik ocağıdırmı?

Bəli, hətta maddi xəstəliklərin özüdür.

Bu yazını yazdığım gün gözüm qəzetdə nəşr olunan bir karikaturaya sataşdı. Mövzumuzla birbaşa əlaqəli idi. Allah-Təala misal olması üçün onu gözümün önünə gətirmişdi.

Karikaturada bir yol və yolun kənarında lövhə çəkilmişdi. Lövhədə "Qərb dəyərləri" yazılmışdı. Yazının altındakı ox Qərb dəyərlərinə gedən yolu göstərirdi. Bir az irəlidə görsənən Qərb dəyərləri də pul, sənaye, lüks həyat, iqtisadiyyat, texnologiya və sərbəst həyatdan ibarət idi.

Yolun ortasında əllərini və ağzını açaraq ac qurd kimi bu "dəyərlər"ə sarı qaçan insanlar vardı. Həmin mənzərənin altında isə "məftunlar" yazılmışdı. Yəni bu dəyərlərə heyran olmuş insanlar.

Bir az irəlidə isə məzar vardı. Məzar torpağına bunlar yazılmışdı: alkoqolizm, QİÇS, boşanma, cinayət, narkotika, əxlaqsızlıq və hər cür pozğunluq... Başdaşında isə THE END yazılmışdı. Yəni acı sonluq.

Həmin mənzərənin altına da "mədfunlar" yazılmışdı. Yəni bu günahlar ucbatından burada basdırılan insanlar.

Məftun=Mədfun

Xülasə:

| | | |
|---|---|---|
| Pul | | Alkoqolizm |
| Sənaye | | QİÇS |
| Texnologiya | BƏRABƏRDİR | Boşanma |
| Sərbəst həyat | | Cinayət |
| Lüks | | Narkotika |
| İqtisadiyyat | | Əxlaqsızlıq və hər cür pozğunluq |

Bütün bunlar da xəstəxana, həbsxana və qəbiristanlığa bərabərdir... İman həyata hakim olmazsa nəticə bu olar. İnanmırsınızsa gedib xəstəxanalardan, həbsxanalardan soruşun, qəbiristanlıqları seyr edin. Oralara düşənlərin əksəriyyəti bu günahlar ucbatından qarşılaşdıqları aqibətlərini sizə söyləyərlər.

Namaz və ibadət bizi məhz bu acı sonluqdan qoruyan zireh, bu kimi mikrobların istilasından xilas edən dərmandır. Ona görə Sultanuş-Şüəra:

“Namaz sancıma əlac, yanıq yerimə məlhəm

Onsuz əbədi həyat mənim olsa istəməm”, - demişdir.

Elə buna görə də Nobel mükafatına layiq görülən Bernard Şou da təqdir hisslərini belə dilə gətirmişdir:

“İki mininci ildə müsəlmanların qıldığı namaz dünya professorları tərəfindən xəstələrə resept kimi yazılacaq”.[13]

Yəni həkimlər xəstəyə:

“Get namaz qıl, sənin dərdinin əlacı namazdır”, - deyəcəklər.

---

13. Vehbi Vakkasoğlu, İslam Dünya Gündeminde, s. 33

## VARLIQLAR BAŞI BOŞDURMU?

Namazdan uzaq insanların zənn etdiyi kimi həqiqətən də varlıqlar başıboş buraxılmışdırmı? Əsla!

Hansı varlığı tədqiq etsəniz, mütləq mühüm və hikmətli bir vəzifəsi olduğunu görəcəksiniz. Məhz hər bir varlıqda müşahidə etdiyiniz hikmətli vəzifə həmin varlığın ibadətidir.

Məsələn, arının vəzifəsi bal hazırlamaqdır. Bu, arının ibadəti, namazı və zikridir. Əgər bunu edirsə, deməli, Yaradana itaət edir. İtaətsə ibadət deməkdir. İnəyin vəzifəsi süd verməkdir. Süd vermək onun namazıdır. Ağacın vəzifəsi bar verməkdir. Meyvə vermək onun namazıdır. Qanımızdakı qan kapilyarlarının vəzifəsi mədəyə gələn qidanı vücudumuzun ən son nöqtələrinə qədər çatdırmaqdır. Leykositlərin vəzifəsi vücudumuza daxil olan mikrobları zərərsizləşdirməkdir. Məhz bütün bunlar həmin varlıqların namazıdır. Onlar bu işləri yerinə yetirərkən itaət edirlər. İtaətsə ibadətdir.

Misalları artırmaq mümükündür. Uzun sözün qısası, heç bir varlıq boşuna yaradılmamışdır. Hər varlığın əhəmiyyətli bir vəzifəsi var və həmin vəzifə o varlığın ibadətidir, namazıdır.

İş görən bir adama “başıboş, avara” desəniz, bu sözünüzlə onu incidər və haqqına girərsiniz. Namaz qılmayan bir insan da ibadətdən uzaq olduğu üçün digər bütün varlıqların başıboş buraxıldığı qənaəti bəxş etdiyi üçün bütün məxluqatın sayı qədər haqqa girmiş olar.

Deməli, namazı tərk etmək əhəmiyyətsiz, adi bir xəta deyil, böyük bir cinayətdir. Bu qədər böyük bir cinayət işləyən bir adamı, məxluqatın sayı qədər haqqa təcavüz edəni və Allahın hikmətli fəaliyyətlərini başıboşluqla ittiham edən birini cəhənnəmlə cəzalandırmaq Quranın yerində işlətdiyi ifaədir.

***Sual:***

Bizim də gördüyümüz işlər var. Dolanışığımızı təmin etmək üçün çalışırıq. Bu işlərimizdən əlavə nə üçün ibadət etməyimiz istənir?

***Cavab:***

İnək də, arı da, toyuq da dolanışığını təmin etməyə çalışır. Qarnını doydurmaq üçün bütün varlıqlar əziyyət çəkir. Lakin onlar qarınlarını doydurmaqdan əlavə işlər də görürlər. İnək süd verir. Kimə verir? İnsana. Arı bal hazırlayır. Kimə? Əlbəttə ki, insana. Toyuq yumurtlayır. Kimin üçün? Təbii ki, insan üçün.

Bütün varlıqların qarnını doydurmaq xaricində işi və vəzifəsi olacaq, sənin olmayacaqmı? Sən sadəcə yemək üçün yaradılmamısan. Əgər elə olsaydı insan kimi yaradılmağa, ağıl sahibi olmağa nə ehtiyac vardı?

Sən sadəcə varlıqların meyvəsini toplayıb, südünü içib, yağını, yumurtasını, balını mənimsəyib kanalizasiyaya axıtmaq üçünmü yaradıldın?

Əgər insanın qarnını doydurmaq xaricində vəzifəsi, namazı olmasa kainatı bir loğmada udan, sonra da çirkaba çevirən gərəksiz bir varlıq, zibil maşını olmaqdan nə fərqi qalar. Allah insanı buna görə yaratmayıb. Bütün varlıqların rəhbəri olsun deyə, ibadəti əmr edib.

Vəzifən namaz, yurdun cənnət olsun, ey gənc!

## HƏR ŞEYƏ MÖHTAC OLAN ACİZ VƏ ZƏİFDİR

Belə bir sual verilə bilər:

İnsan oğlu elmi və texniki inkişafla hər şeyə nail oldu. Nə üçün aciz və zəif deyirik?

Cavab:

Allahın bəxş etdiyi ağıl sayəsində bir çox şeyə hakim oldunuz. Yaxud da ola bilərsiniz. Amma əsla acizlikdən, möhtac olmaqdan xilas ola bilməyəcəksiniz.

"Mən xəstələnmirəm, yaşlanmıram" deyən insan varmı? "Mən ölməyəcəyəm" deyən insan varmı? Yox. Xəstəliyə, qocalığa və ölümə məğlub olan insan oğlu acizdir. Elə isə həddini bilməlidir. "Havaya, günəşə və suya ehtiyacım yoxdur", - deyən varmı? "Oduna, qaza, kömürə, yaza, qışa ehtiyacım yoxdur" – deyən varmı? "Yeyib-içməyə, tuvaletə ehtiyacım yoxdur" – deyən varmı? Xeyr.

Bunlara ehtiyacınız olduğu müddətdə acisiniz, zəifsiniz, kasıb və möhtacsınız. Bu nemətlərə möhtac olduğunuz müddətdə onların sahibinə də möhtacsınız.

Qışı bahara, gecəni gündüzə çevirən kimdir? Allah. Otu südə, gübrəni gülə çevirən kimdir? Allah. Odun və kömürü dağlarda anbara vuraraq saxlayan kimdir? Allah. Yerin daxilini neft, səthini taxıl zəmisi yaradan kimdir? Allah. Kainatı və içindəki varlıqları atomdan qalaktikalara qədər min bir nəğmə ilə dilə gətirən və coşduran, kainatı sərgiyə çevirib sənət əsərini insana tamaşa etdirən kimdir? Allah.

Elə isə əbədiyyən Allaha möhtacsınız, borclusunuz. Ehtiyacınızı, acizliyinizi, sevginizi və ehtiramınızı Ona ərz etməyin ən mükəmməl yolu hər gün qıldığınız beş vaxt namazdan keçir.

Hansı namaz? Yaxşılıqları əmr edən, pislikdən çəkindirən, haram və haqsızlıqdan, günahdan uzaqlaşdıran namaz. İçində Allah eşqi, sevgi və qorxu olan namaz.

Hz. Aişə anamız buyurur: "Rəsulullah (s.ə.s) bizimlə söhbət edir, biz də onunla söhbətləşirdik. Namaz vaxtı girəndə bizi tanımadığını dedi. Bunun səbəbi Allahın böyüklüyü qarşısında özünü unutması, Ona olan məhəbbətinin əzəməti idi".[14] Məhz belə bir namaz və ya ona yaxın namaz.

14. Kimyayi-Səadət, İmam Qəzali tərc. A.F. Meyan s. 138

İnsan namaz fabrikidir

“Filankən yaxşı adamdır, heç bir qüsuru yoxdur, sadəcə namazını qılmır”, - demək bilirsinizmi nəyə oxşayır?

Bu televizor çox yaxşıdır, amma göstərmir. Bu toyuq çox yaxşıdır, amma yumurtlamır. Bu inək çox yaxşıdır, amma süd vermir. Bu oğlan çox əxlaqlıdır, amma ata-anasına itaət etmir, sözlərinə qulaq asmır.

Qardaşım, televizordan gözlədiyimiz görüntünü əks etdirməsi, toyuqdan gözlədiyimiz yumurtlamaq, inəkdən gözlədiyimiz süd verməsi, övladdan da gözlənən ata-anasına itaət etməsidir.

Əgər televizor göstərmirsə, toyuq yumurtlamırsa, inək süd vermirsə, uşaq ata-anasına itaət etmirsə, necə yaxşı ola bilər? Ola bilməz. Çünki onlardan gözlənən əsas tələbata cavab vermirlər.

İnsan da özündən gözlənənə cavab vermirsə, o da yaxşı adam ola bilməz. İnsan namaz fabrikidir.

İnsandan əsas gözlənən namazdır. Çünki insan yalnız və yalnız Allahı tanımaq, Onun əmrlərini yerinə yetirmək, ibadət, istiqamət və dürüstlükdən ayrılmamaq üçün yaradılmışdır. Bundan başqa heç bir qayəsi yoxdur. İnsan əsl vəzifəsini yerinə yetir-

mədən nə edirsə-etsin, əbəs yerə yorulmuş, boşuna yaşamış olar. İnsanların nəzərində yaxşı olsa da Haqqın nəzərində yaxşı qəbul edilməyəcək və yaxşıların getdiyi yerə gedə bilməyəcək.

Haqq-Təala hər kəsi qəlbinə və beynindəkinə görə dəyərləndirir. İmanın və ibadətin yalnız Allah qatında dəyəri var. Maşın, villa, göydələn, var-dövlət insanla qəbrə getmədiyi üçün heç bir dəyəri yoxdur. Bizimlə qəbrə yalnız iman və ibadətimiz girəcək. Əks halda Allah-Təala:

- Afərin sizə. Dünyada çox gözəl göydələnlər, villalar, təsisatlar tikib qurdunuz. Müxtəlif maşınlarda gəzdiniz. Gözəl nemətlərlə qidalandınız. Çox şıq geyindiniz. Xeyli pul xərclədiniz. Mənə yox, fahişələrə tapınırdınız. Cənnətə layiqsiniz, buyurun, cənnətə, - deməyəcək, əksinə:

- Siz yalandan da olsa dünyada ikən cənnəti yaşadınız. Artıq sizə cənnət yoxdur[15], ey günahkarlar bu tərəfə ayrılın,[16] - deyəcək, onları cənnətliklərin içindən ayıraraq cəhənnəmə sövq edəcək. Digər tərəfdən də cənnətliklərə belə səslənəcək:

- Ey mənim söz dinləyən sadiq bəndələrim, ey qeyri-məşru ləzzətlərə sədd çəkən, haramlara, gü-

---

15. əş-Şura, 20; əl-İsra, 18
16. Yasin, 59

nahlara batmayan, halalından və halal loğmadan ayrılmayan, namuslu və dürüst qullarım! Aclığa, susuzluğa dözüb oruc tutan, isti-soyuq demədən beş vaxt namaz qılan, həcc edən, verdiyi zəkat və sədəqələri ilə yoxsul bəndələrimi sevindirən, İslama xidmət edənlərə dəstək olan, dünyada minlərlə məhrumiyyətə xəstəlik və müsibətə qatlanan, ibadət və itaətdən ayrılmayan səmimi qullarım! Siz dünyada  məni unutmadınız. Dünyanın fani bər-bəzəyinə, saxta cənnətinə aldanıb İslamı unutmadınız. Dünyadakı cəhənnəm hurilərinə, manikenlərə, artistlərə və yer üzünü ləkələyənlərə aldanmadınız. Leylanı alıb Mövlanı unutmadınız.

Mən də sizə gözlərin görmədiyi, xəyalınıza gəlməyən bir cənnət hazırladım. Xəstəliyi, qocalığı, ölümü və ayrılığı olmayan bir cənnət. Dedi-qodunun, hərc-mərcliyin olmadığı, istədiyiniz hər şeyi önünüzdə tapdığınız bir cənnət. Hurisi, qılmanı, dostu və sevəni çox olan bir cənnət, gördükdən sonra çıxmaq istəməyəcəyiniz, kaş bir az erkən gələydim, - deyəcəyiniz bir cənnət hazırladım. Orada əbədi qalmaq üçün buyurun, ey mənim sadiq qullarım, xoş gəldiniz![17]

---

17. əz-Zumər, 73

## GƏLƏCƏK VƏ NAMAZ

Ey insan, sən sırf dünya üçünmü yaradılmısan ki, bütün vaxtını ona sərf edirsən? İstedad və qabiliyyət baxımından bütün heyvanlardan üstünsən. Amma güc və qüvvət etibarı ilə hətta bir sərçəyə çatmayacaq qədər acizsən. O, bir neçə şeyə möhtac olduğu halda sən hər şeyə möhtacsan.

Ey insan, elə isə nə üçün əsl vəzifənin heyvan kimi çabalamaq olmadığını, əbədi gələcək üçün müsəlman kimi yaşamaq olduğunu anlamırsan? Sən dünya üçün yaradılmadın. Dünya üçün yaradılsaydın, ölməzdin. Sən axirət üçün yaradıldın. Bu dünyaya cənnəti qazanmaq üçün göndərildin. Namaz qılmaqla mükəlləfsən.

Əgər:

- Məni namazdan və ibadətdən uzaqlaşdıran zənn etdiyiniz kimi gərəksiz şeylər deyil, əksinə, dolanışığı təmin etmək üçün zəruri işlərdir, deyirsənsə, sənə cavabım budur:

- Əlbəttə ki, dinimiz dolanışığını halal yoldan təmin etməyi və başqalarına yük olmamağı fərz qılmışdır. Bu yolda çalışmaqda haqlısan. Amma işləmək üçün namazı tərk etməkdə haqsızsan. Çünki namaz qılmadan çalışmağın sonu acıdır, fəlakətdir, cəhənnəmdir. Namaz qıldıqdan sonra çalışmaqsa səadət və ibadətdir, sonu isə cənnətdir.

Sənə bir misal verim. Fərz et ki, günü otuz manata işləyən fəhləsən. Bir nəfər gəlib desə ki:

- Beş dəqiqə buranı qaz, üç min manatlıq bahalı daş tapacaqsan.

Nə edərsən?

- Böyük məmnuniyyətlə. Bu dəqiqə gəlirəm, - deyərsən, yoxsa:

- Xeyr, gələ bilmərəm. Bəli on beş dəqiqəyə üç min manatlıq mücövhər tapacağam, amma səkkiz saat işləyib alacağım otuz manatdan olacağam deyərsən?

Əgər ağlın başındadırsa, əlbəttə ki, üç min manat qazanacağın on beş dəqiqəlik işi seçərsən. Əks halda dəlilik və axmaqlıq etmiş olarsan.

Ey beş vaxt namazı çox görən sərsəm nəfsim və binamaz qardaşım, axırzaman Nəbisi və onun varisləri belə deyirlər:

- Ey insanlar, gəlin on-on beş dəqiqəlik bu işi görün. Yəni Haqqın hüzuruna durun, beş vaxt namazı qılın. Əvəzində üç min manatlıq ləl-cəvahir deyil, bütün mücövhərlərin qaynağı, səfa diyarı olan cənnəti qazanacaqsınız. Gəlin iyirmi dörd saatlıq ömrünüzün bir saatını müsəlmanlığın tələbinə ayırın, ölüm, qocalıq və xəstəlik olmayan cənnəti qazanın.

XXI əsrin insanı bu çağırışa:

- Xeyr, bizim vaxtımız planlı-proqramlıdır. Nəinki on beş dəqiqə, heç bir dəqiqə də ayıra bilmərik, desə nə olar, bilirsinizmi?

Səkkiz saata alacağı otuz manata görə on beş dəqiqədə qazanacağı üç mini rədd edən axmaq adama bənzəyər. Hamının gülüş obyektinə çevrilər.

On beş dəqiqədə cənnəti qazanırsan, dostum. Namaz və digər islami xidmət və fəaliyyətlərinlə heçlikdən, yoxluqdan xilas olursan. Ölümün, qocalığın və xəstəliklərin beynində meydana gətirdiyi təlatümlərə çarə tapırsan, bu nemət rədd edilər-

mi? Rədd edirsənsə necə ağıllı olduğunu deyə bilərsən?

"Çalışıb gələcəyimi təminat altına almalıyam" - deyirsən, gələcəyin üçün pul yığırsan. Amma yaxşı bilirsən ki, altmış il yaşamağa zəmanətin yoxdur. Zəmanəti olmayan həyat üçün var gücünlə çalışırsan, amma əbədi həyat üçün beş vaxt namazı çox görürsən. "Sonu yoxdurmu?" – deyib nə üçün şeytanları özünə güldürürsən.

Əziz qardaşım, əgər dünyada əbədi qalsaydın, bu sözünə haqq verərdim. Amma biz faniyik. Qədərimizdə ölüm var. Nə zaman, harada öləcəyimiz bəlli deyil. Elə isə səbrini keçmişə və gələcəyə sovurma. Keçən günlərdə işlədiyin ibadətin zəhməti bu gün rəhmətə çevrilib. Acısı gedib, savabı qalıb. Gələcək günlərsə hələ gəlməyib. Elə isə qılacağın namazı son namazın kimi qıl. Allahın hüzuruna bu düşüncə ilə çıxsan, bezmək bir tərəfə, namazın həzzini yaşayarsan.

## Gələcəyin tərifi

Ey gənc!

İlğımı bizə su kimi göstərdilər və göstərməyə davam edirlər. Qaçırıq, yorulub dəri-qabıqdan çıxırıq, amma heç cür əlimiz çatmır. İstiqbalı da

bizə belə tərif edirlər. Yaşayıb-yaşayamayacağım bəlli olmayan iyirmi-otuz illik gələcəyə gələcək demirəm. Özümüzü, uşaqlarımızı və millətimizi aldatmayaq. Əsl gələcək gələn, lakin sonu olmayan istiqbaldır. O da axirət və cənnətdir. Gənclərə istiqbal olaraq cənnəti göstərsəniz dünya da cənnətə dönər. Buna müvəffəq olmasanız anarxiya cəhənnəminin zəbaniləri cənnət yurdunuzu belə cəhənnəmə çevirər. Sonra da axirətin cəhənnəmi ilə qarşılaşarsınız.

Nə qədər parlaq da olsa fani istiqbalı nə edək?

Bir padşah ehtişamlı saray tikdirir. O dövrün tanınmış mürşidlərindən birini çağırıb sarayı başdan-ayağa gəzdirdikdən sonra qürurla soruşur:

- Necədir, sarayı bəyəndiniz?

Mövlanın qulu maddənin quluna bu cavabı verir:

- Çox gözəldir, amma nöqsanı var. Bəqası yoxdur. Yəni əbədi deyil, fanidir. Sən də fanisən, tikdirdiyin villan da.

Bu dünyada neçə-neçə parlaq gələcəyə can atanlar və ona qovuşduğunu zənn edənlər istiqballarıı ilə birlikdə bu gün məzarlıqda yatırlar. Bəlkə də bir çoxu indi dizinə döyüb peşmanlıq edir

- Kaş namazımı qılaydım, gecələr qalxıb Rəbbimin hüzurunda divana duraydım, iki damla göz yaşı axıdaydım, iki rükət namaz qılaydım.

İslam böyüklərindən Kəttani belə deyir: Yuxuda Cüneyd Bağdadini gördüm. "Vəfat etdikdən sonra Allah səninlə necə rəftar etdi?" – deyə soruşdum. Böyük vəlilərdən olan Cüneyd həzrətləri bu cavabı verdi: "Şəfqət və mərhəməti ilə qarşıladı. Amma bütün əmək və səylərim boşa getdi. Məni (beş vaxt namazımla) yalnız bir gecə qıldığım iki rükət namaz qurtardı".

İmam Qəzalinin "Ehya"sından bir iqtibasla nöqtəni qoyaq:

"Əməlisaleh bir insan məzara qoyulduğu vaxt yaxşı əməlləri (ibadət və xeyir işləri) ətrafına toplaşar. Əzab mələkləri ayaq tərəfindən gəldikdə namaz önlərini kəsər. "Bu adam Allah üçün ayaq üstə çox qaldı, ondan uzaq durun", - deyər. Əzab mələkləri baş tərəfindən gəldikrə oruc önlərini kəsər. "Bu adam dünyada Allah üçün çox ac-susuz qaldı. Sizə izin verməərəm", - deyər. Bədən tərəfindən gəldikdə həcc ibadəti, Allah yolundakı səyləri qarşılarına çıxar və: "Bu bədən Allah üçün çox əziyyət çəkdi", - deyər. Əl tərəfindən gəldikdə etdiyi xeyirlər, verdiyi sədəqələr qarşılarına çıxar,

“buna toxunmayın, bu əli ilə çox sədəqə və zəkat vermişdi”, - deyər.

Bu zaman əzab mələkləri “maşallah, bərəkallah” deyib geri qayıdarlar. Bu səfər rəhmət mələkləri cənnətdən ona bir yataq gətirərlər. Əməlisaleh adamın məzarı gözü ilə görə bildiyi qədər geniş və rahat olar. Cənnətdən bir çıraq da gətirərlər. Namazını qılan həmin adam onun nuru altında (cənnət bağçasına çevrilən qəbrində) qiyamətə qədər gözləyər”.[18]

---

18 Ehyayi-Ulumiddin, İmam Qəzali, 15. Bölüm, s. 190-191

## ANA BƏTNİNDƏ AĞIZ, DÜNYADA NAMAZ

Namazın bu qədər mühüm və lüzumlu olduğuna inanmayanlar bir gün utanıb xəcalət çəkəcəklər. Həm də çox utanacaqlar.

Gəlin bunu bir misalla izah edək.

Ana bətnindəki bir uşağın ağzı, gözü, qulağı, əl-ayağı var. Bütün əzaları kamil şəkildə yerindədir. Halbuki orada bunların heç birinə gərək yoxdur. Körpə qidasını anasına bağlı olan göbəyi vasitəsilə təmin edir.

İndi həmin uşaq:

- Ya Rəbb, bu göbək kordonu mənə bəsdir. Ağıza, gözə, qulağa, əl-ayağa nə gərək var, heç nəyə yaramır? – desə, Allah bu cavabı verər:

- Tələsmə, qulum, anlamadığın işə burnunu soxma. Sən tezliklə elə bir aləmə gedəcəksən ki, burada "hər şeyim" dediyin xortum orada heç nəyə yaramayacaq, kəsilib atılacaq. Gərəksiz zənn

etdiyin ağız, göz, qulaq kimi əzalar da hər biri böyük işlərə yarayacaq.

Həmin uşaq bu həqiqətə inanmasa və inkarçı olaraq dünyaya gəlsə, göbək kordonunun kəsilib atıldığını, lüzumsuz gördüyü ağız, göz kimi orqanların böyük işlər üçün lazım olduğunu görsə, utanar, ya yox? İnanmadığı üçün dizlərini döyər, ya yox?

Hal-hazırda biz də həmin uşaq kimi anamızın bətnindəyik. 9 ay, 9 il və ya 90 il sonra başqa bir dünyaya göz açacağıq. O dünyanın adı axirətdir. Biz indi maddi göbəklə, mədəmizlə bu dünyaya bağlıyıq.

Əgər biz:

- Gül kimi yaşayırıq, ey Rəbbimiz! Bu namaza, oruca, həccə, zəkata, dinə, imana, İslama nə gərək vardı, dediyimiz təqdirdə Rəbbimizdən bu cavabı alacağımız qətidir:

- Ey bəndələrim, qısa bir müddətdən sonra bu dünyadan gedəcəksiniz. Sizi elə bir aləmə aparacaqlar ki, orada "hər şeyim" dediyiniz bu maddi vasitələrin heç biri işə yaramayacaq. Gərəksiz gördüyünüz namaz, zəkat, həcc kimi ibadətlər də vazkeçilməz olacaq. Orada insanın maşınına, var-döv-

lətinə, sərvət və surətinə görə deyil, qəlbinə, əməl və ibadətinə, namazına görə dəyər veriləcək.

Yəni namazınız, zəkatınız, orucunuz, həcciniz, xeyir əməlləriniz axirətdə sizin hər şeyiniz olacaq. Əl-ayaq, dil-dodaq olacaq. Villa, hovuz, yaxta, təyyarə olacaq. Sonsuz zənginlik və səadət olacaq, bir sözlə cənnət olacaq.

Əgər özümüzü çoxbilmiş görsək, elm və texnika əsrində olduğumuzla qürrələnsək, Rəbbimizin hikmət dili ilə buyurduğu bu gerçəkləri qəbul etməz, ibadətdən məhrum tənbəl və ya inkarçı olaraq axirət yurduna getsək, orada gerçəkləri görüb utanmyacağıqmı? Var-dövlətimizin, göydələnlərimizin, pulumuzun heç nəyə yaramadığını görüb ibadətlərin hər şey olduğunu anlasaq, ana bətnində ikən ağızı lüzumsuz görən doğulmamış körpə kimi utanıb dizimizi döyməriknmi? “Kaş inanaydıq, kaş namazımızı qılaydıq, orucumuzu tutardıq, zəkatımızı verəydik, Allah üçün yaşasaydıq, Hz. Muhammədin yolundan getsəydik”, - deməriknmi?

Peşman olacağın, dizlərini döyəcəyin o gün gəlmədən ağlını başına topla, əziz qardaşım! Dinini öyrən. Tövbə et, namaza başla. Bir tərəfdən də qılmadığın namazların, zəkatın qəzasını et. Əsla ümidsizliyə qapılma, ümidvar ol!

## MÜNDƏRİCAT